QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Noyabr 2017
№ 7(1086)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Bakı Dövlət Universitetinin 100 illik yubileyinin keçirilməsi haqqında

## *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

2019-cu ildə Azərbaycanın nüfuzlu elm və təhsil ocağı Bakı Dövlət Universitetinin təsis edilməsinin 100 illiyi tamam olur.

Azərbaycan Xalq Cümhuriyyətinin yadigarı Bakı Dövlət Universiteti müsəlman Şərqində yeni tipli ilk ali məktəb kimi yarandığı vaxtdan etibarən nailiyyətlərlə zəngin şərəfli bir yol keçmişdir. Daim azərbaycançılıq məfkurəsinə sadiqlik nümayiş etdirən Universitetin ölkədə ali təhsil sisteminin qurulmasında, elmi tədqiqatların dərin məzmun kəsb edərək son texnologiyaların da tətbiqi ilə müasir standartlara uyğun aparılmasında və ümumən milli özünüdərk prosesinin sürətləndirilməsində təqdirəlayiq xidmətləri vardır.

Bakı Dövlət Universiteti tarixən vətənpərvər ziyalıların fədakar əməyi sayəsində yetirdiyi ictimai-siyasi, elm və mədəniyyət xadimləri ilə Azərbaycanın mövcud simasının təşəkkülünə böyük töhfələr vermişdir. Respublikada yaradıcı elmi təfəkkürün innovativ ideyalar əsasında formalaşdırılması, hazırlıqlı kadr potensialının davamlı təkmilləşdirilməsi və elmi-intellektual mühitin inkişaf səviyyəsinin daha da yüksəldilməsi, o cümlədən Azərbaycan xalqının tarixi-mədəni dəyərlərinin və mənəvi-əxlaqi sərvətlərinin qorunub yaşadılması Universitetin dünya təhsil məkanına inteqrasiya yolu seçməklə göstərdiyi bugünkü çoxşaxəli, geniş fəaliyyətin başlıca istiqamətlərini təşkil edir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq və ölkədə ali təhsilin, elmin ənənələrinin zənginləşdirilməsində, gənc nəslin müstəqil dövlətçilik ideallarına sədaqət ruhunda tərbiyəsində mühüm xidmətlərini nəzərə alaraq, Azərbaycan xalqının milli sərvəti Bakı Dövlət Universitetinin 100 illik yubileyinin layiqincə qeyd olunmasını təmin etmək məqsədilə **qərara alıram:**

1. Bakı Dövlət Universitetinin 100 illik yubileyi dövlət səviyyəsində qeyd edilsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti Bakı Dövlət Universitetinin 100 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 14 noyabr 2017-ci il*

# Elmi Şuranın iclası

**Noyabrın 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə ADPU-nun Ağcabədi Filialının fəaliyyəti haqqında, Davamlı təhsil və təlim şöbəsinin fəaliyyəti haqqında, Sabah qruplarının fəaliyyəti haqqında və cari məsələlər daxildir.**

ADPU-nun Ağcabədi Filialının direktoru, dosent Mətanət Fərzəliyeva filialın fəaliyyəti haqqında məlumat verərək bildirib ki, filial orta məktəblər üçün 5 ixtisas üzrə müəllim kadrları hazırlayan, tədris-metodik və elmi fəaliyyəti həyata keçirən ali təhsil müəssisəsidir. Tədris olunan fənlər tədris planına əsasən müəyyənləşdirilir. Filialda tədris prosesi tələbə və tədrisin idarə olunması şöbəsi, dekanlıq və kafedralar tərəfindən təşkil olunur. Tədrisin təşkilində 2 formadan: əyani və qiyabi təhsil formalarından istifadə olunur. Filialda 5 ixtisas: "İbtidai sinif müəllimliyi" (əyani və qiyabi), "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi", "Tarix və coğrafiya müəllimliyi", "Riyaziyyat və informatika müəllimliyi", "Məktəbəqədər təlim və tərbiyə" ixtisasları üzrə əyani şöbədə 553 nəfər tələbə, qiyabi şöbədə isə 12 nəfər tələbə olmaqla, cəmi 565 nəfər tələbə təhsil alır. Onlardan 28 nəfəri dövlət sifarişi, 537 nəfəri isə ödənişli əsaslarla təhsil alırlar.

Filialın professor-müəllim heyəti 45 nəfərdən ibarətdir. Onlardan 8 nəfəri fəlsəfə doktoru, dosent, 3 nəfəri fəlsəfə doktoru,dosent əvəzi, 3 nəfəri fəlsəfə doktoru,baş müəllim, 21 nəfəri baş müəllim, 10 nəfəri müəllimdir. Tədris-köməkçi heyəti 45 nəfərdən ibarətdir. Filialda 1 fakültə-Pedaqoji fakültə fəaliyyət göstərir. 4 kafedra var: Riyaziyyat, informatika və onların tədrisi metodikası kafedrası; Dillər, ədəbiyyat və onların tədrisi metodikası kafedrası; İctimai, təbiət fənləri və onların tədrisi metodikası kafedrası; Xüsusi və ümumelmi fənlər kafedrası.

Tələbələr tədris planına uyğun olaraq Ağcabədi şəhər 3 və 8 nömrəli tam orta məktəblərdə və uşaq bağçasında pedaqoji təcrübə keçirlər. Filial fəaliyyəti dövründə müxtəlif ixtisaslar üzrə 2 mindən çox pedaqoji kadr hazırlamışdır. Müntəzəm olaraq filialın maddi-texniki bazasının gücləndirilməsi və təhsilin keyfiyyətinin yüksəldilməsi üçün innovativ təlim metodlarının tətbiq edilir. Son 5 ildə filiala qəbul zamanı keçid ballarında yüksək dinamika özünü göstərir. Filialın professor-müəllim heyəti tədris və elmi-tədqiqat sahəsində səmərəli fəaliyyət göstərir.



Elmi Şura dosent M.Fərzəliyevanın hesabatını qəbul edib.

Davamlı təhsil və təlim şöbəsinin fəaliyyəti haqqında çıxış edən şöbənin müdiri, dosent Vaqif İsrafilov bildirib ki, 2016-2017-ci tədris ili üçün təkrar ali təhsildə "Azərbaycan dili və ədəbiyyatı", "Riyaziyyat və informatika", "İbtidai təhsil", "Kimya və biologiya", "Tarix və coğrafiya", "Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim", "Fizika və texnologiya" ixtisaslarında 44 nəfər təhsil alır. Yenidənhazırlanma təhsili üzrə isə Təhsil Nazirliyinin qeydiyyatından sonra ADPU-da mövcud olan fakültələr üzrə 99 nəfərin sənədi tam olaraq yenidənhazırlanma təhsilinə uyğun olmuşdur. Universitetdə yaradılmış müsahibə komissiyalarının birgə rəyinə əsasən onlardan 74 nəfəri müsahibədə iştirak edərək komissiyaların ümumi rəyi əsasında yenidənhazırlanma təhslinə qəbul olunmuşlar. 2016-2017-ci tədris ilində yenidənhazırlanmada 4 ixtisas üzrə 68 nəfər dinləyici təhsil almışdır.

2017-2018-ci tədris ilində ADPU-ya 15 ixtisas -"Azərbaycan dili və ədəbiyyatı müəllimliyi", "Riyaziyyat müəllimliyi", "İnformatika müəllimliyi", "Riyaziyyat və informatika müəllimliyi", "Tarix müəllimliyi", "Coğrafiya müəllimliyi", "Tarix və coğrafiya müəllimliyi", "İbtidai sinif müəllimliyi", "Məktəqədər təlim və tərbiyə", "Korreksiyaedici təlim", "Təhsildə sosial-psixoloji xidmət", "Kimya müəllimliyi", "Biologiya müəllimliyi", "Kimya və biologiya müəllimliyi", "Fizika müəllimliyi" ixtisasları üzrə ümumilikdə 132 nəfər təkrar ali təhsilə cəlb olunub. Bu il ADPU-ya 11 ixtisas üzrə 398 nəfər yenidənhazırlanma təhsili üçün müraciət edib. Təhsil Nazirliyinin müvafiq razılıq məktubu əsasında 395 nəfər müsabiqəyə buraxılıb.

Elmi Şura dosent V.İsrafilovun hesabatını qəbul edib.

SABAH qruplarının ADPU üzrə koordinator-rəhbəri Lalə Mürsəlbəyova çıxışında bildirib ki, SABAH qruplarının yaradılmasında məqsəd savadlı, bacarıqlı və hazırlıqlı tələbə yetişdirmək, ali təhsildə tədrisin keyfiyyətinin yüksəltmək, ali təhsil sistemində yeni, fərqli mühit yaratmaq və müasir əmək bazarının tələblərinə uyğun mütəxəssis hazırlamaqdır.ADPU-da hazırda SABAH qruplarında "İbtidai sinif müəllimliyi" və "Riyaziyyat-informatika müəllimliyi" ixtisaslarında tələbə hazırlığı həyata keçirilir. 2016-2017-ci tədris ilində ADPU-nun SABAH qruplarını 22 nəfər bitirib. Onlardan 5 nəfəri maqistraturaya, 10 nəfəri orta məktəblərə işə qəbul olunub, 4 nəfəri isə özəl şirkətlərdə işlə təmin ediliblər. ADPU-nun SABAH qruplarının tələbələri SABAH Tələbələrinin Forumunda, müxtəlif layihə və proqramlarda, eləcə də universitetimizin ictimai-mədəni həyatında fəal iştirak ediblər. Lalə Mürsəlbəyova həmçinin çıxışında ADPU-nun SABAH qrupları qarşısında duran məqsəd və planlardan danışaraq onların həyata keçirilməsi ilə bağlı təkliflər irəli sürüb.

Elmi Şura Lalə Mürsəlbəyovanın hesabatını qəbul edib.

Cari məsələlərin müzakirəsi zamanı Müsabiqə Komissiyasının sədri, professor Əzizxan Tanrıverdiyev universitetdə keçirilən fakültə dekanlarının və kafedra müdirlərinin müsabiqəsinin nəticələri barədə məlumat verib. Qeyd edib ki, müsabiqənin keçirilməsini təmin etmək məqsədilə tərkibinə tanınmış, təcrübəli və nüfuzlu pedaqoq-alimlərin daxil olduğu 25 nəfərdən ibarət Komissiya yaradılıb. Universitetdə 4 fakültənin dekanı və 16 kafedranın müdiri müsabiqə yolu ilə seçilib. Müsabiqə obyektiv və şəffaf keçirilib. Təbii ki, mütəxəssislərin belə seçimi ADPU-da elm və təhsilin səviyyəsinin yüksədilməsində, universitetin daha sürətli inkişafında və fəaliyyətinin təkmilləşdirilməsində xüsusi rol oynayacaqdır. Fakültə dekanlarının və kafedra müdirlərinin müsabiqəsinin keçirilməsi mütəxəssislərin seçilməsinə yeni, müasir yanaşmadır və bu, digər ali təhsil müəssisələri üçün layiqli nümunə ola bilər.

Professor Ə.Tanrıverdiyev həmçinin ADPU-nun Ağcabədi Filialında aparılan monitorinqin nəticələri barədə məlumat verib. Məlumatda filialın idarəetmə, tədris və elmi-tədqiqat fəaliyyəti ətraflı təhlil edilib, mövcud çatızmazlıqların aradan qaldırılması və qarşıda duran vəzifələrin həyata keçirilməsi üçün təkliflər öz əksini tapıb.

İclasda digər cari məsələlər müzakirə olunub, professor attestatı, elmlər doktoru diplomu və dosent attestatları, həmçinin universitetdə uzunmüddətli səmərəli elmi-pedaqoji və əmək fəaliyyəti göstərən müəllimlərə və əməkdaşlara təşəkkürlər təqdim edilib, universitetin tanınmış və nüfuzlu pedaqoq-alimlərindən ibarət Ağsaqqallar Şurasının yaradılması barədə qərar qəbul olunub.

Sonda rektor Cəfər Cəfərov Elmi Şurada qarşıya qoyulan vəzifələrin həyata keçirilməsi üçün Elmi Şura üzvlərinə öz tapşırıq və tövsiyələrini verib.

**Mənsur İbrahimli**

# Yeni Azərbaycan Partiyasının yaradılmasının 25-ci ildönümünə həsr edilmiş tədbir

Noyabrın 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Yeni Azərbaycan Partiyasının (YAP) yaradılmasının 25-ci ildönümünə həsr edilmiş tədbir keçirilib.Tədbirdə ADPU-nun rəhbərliyi, müəllim və tələbələri iştirak ediblər. Tədbirdə öncə Azərbaycanın Dövlət Himni səsləndirilib.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, bu gün xalqımızın həyatında əlamətdar bir gündür. Bu gün YAP-ın yaradılmasının 25 ili tamam olur. Ulu öndərimiz Heydər Əliyevin yaratdığı və Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin Sədri olduğu YAP ölkəmizin aparıcı siyasi qüvvəsi, Cənubi Qafqazın ən böyük partiyasıdır. Bu partiya Azərbaycanı hərc-mərclikdən, böhrandan, tənəzzüldən xilas edərək sürətli inkişafa aparıb. Bu gün öz sıralarında 700 mindən çox məsləkdaşı birləşdirən YAP ölkəmizin ən güclü və ən nüfuzlu siyasi təşkilatıdır. YAP üzvlərinin 40 faizini gənclər təşkil edir. Cəmiyyətimizin avanqard qüvvəsi olan YAP-ın üzvləri kimi bizim üzərimizə mühüm vəzifələr düşür. Müasir dövr bilik və bacarqlara olan tələbatı daha da artırıb. Həmişə müəllim adına, müəllim əməyinə böyük qiymət verən ulu öndər Heydər Əliyev demişdir: “Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram”. ADPU ölkəmizin məktəblərini dərin biliyə, geniş dünyagörüşünə, milli-mənəvi dəyərlərimizə bağlı olan mütəxəssislərlə təmin etməlidir. Ölkə rəhbərliyi bu mühüm, şərəfli və məsuliyyətli vəzifəni bizim qarşımıza qoyub. Biz bu vəzifəni uğurla həyata keçirmək üçün əzmlə çalışmalı, qarşımıza qoyduğumuz məqsəd və hədəflərə yetişmək üçün bütün





qüvvələrimizi səfərbər etməliyik.

Rektor qeyd edib ki, dövlət başçımız cənab İlham Əliyevin 18 noyabr 2017-ci il tarixli sərəncamları ilə Azərbaycanın ictimai-siyasi həyatında fəal iştirak etdiklərinə, eləcə də təhsilin inkişafında göstərdikləri xidmətlərə görə ADPU-nun 6 nəfər əməkdaşı müxtəlif dövlət təltiflərinə layiq görülüblər. Bu, bizi çox sevindirir və verilən yüksək qiymətə görə ölkə rəhbərliyinə təşəkkür edirik.

YAP-ın Səbail rayon təşkilatının “Pedaqoqlar” ərazi ilk təşkilatının sədri, professor Himalay Qasımov və 91-lərdən biri, dosent Maqsud Nəcəfov çıxış edərək partiyanın yaranma tarixi, keçdiyi böyük və şərəfli inkişaf yolu barədə ətraflı danışıblar. Qeyd edilib ki, YAP qısa bir müddət ərzində öz sıralarını xeyli genişləndirib, ümumxalq partiyası kimi məşhurlaşıb. YAP güclü və mütəşəkkil siyasi partiya olaraq Azərbaycanın strateji hədəflərinin müəyyən olunmasında, ölkəmizin dünya miqyasında tanınmasında dövlətimizin mühüm dayağına çevrilib. “Pedaqoqlar” ilk ərazi partiya təşkilatı YAP-ın fəal təşkilatlarından biridir. Ulu öndərimiz Heydər Əliyevin böyük uzaqgörənliklə dediyi kimi, “YAP dünənin, bu günün və gələcəyin partiyasıdır”.

Tədbirdə YAP-ın Himni səsləndirilib, həmçinin partiyanın fəaliyyətini əks etdirən videoçarx göstərilib.

Tədbir tələbə-gənclərin hazırladıqları bədii hissə ilə başa çatıb.



# Professor Həsən Mirzəyevin 90 illik yubileyinə həsr olunmuş tədbir

Noyabrın 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) professor Həsən Mirzəyevin 90 illik yubileyinə həsr olunmuş tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, millət vəkilləri, universitet rektorları, Yeni Azərbaycan Partiyasının (YAP) və Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) məsul şəxsləri, şair və yazıçılar, ziyalılar, incəsənət xadimləri, universitetin müəllim və tələbələri iştirak ediblər. Tədbirdən öncə yubiley iştirakçıları professor Həsən Mirzəyevin əsərlərindən ibarət sərgi ilə tanış olublar.

Tədbirdə giriş sözü ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov qonaqları salamlayaraq onları rəhbərlik etdiyi universitetdə görməkdən məmnunluq duyduğunu bildirib. Rektor professor Həsən Mirzəyevin həyat və fəaliyyəti haqqında məlumat verərək bildirib ki, Həsən Mirzəyev 1927-ci il noyabr ayğngn 26-da Dərələyəz mahalındakı Qovuşuq kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra 1948-1950-ci illərdə Naxzgvan Dövlət Müəllimlər İnstitutunda, 1951-1955-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunda (indiki ADPU) ali təhsil alıb. H.Mirzəyev əmək fəaliyyətinə 1950-ci ildə doğma kəndində orta məktəb müəllimi kimi başlayıb. 1955-ci ildə ali təhsilini başa vurduqdan sonra rayon xalq maarif şöbəsinin inspektoru və Qovuşuq kənd orta məktəbinin müəllimi, 1957-1959-cu illərdə isə məktəb direktoru işləyib. H. Mirzəyev 1959-1962-ci illərdə ADPİ-də “Azərbaycan dilçiliyi” ixtisası üzrə aspiranturada təhsil alıb. Aspiranturanı bitirdikdən sonra ömrünün sonunadək ADPU-da işləyib. O, müxtəlif illərdə müəllim, baş müəllim, dosent, professor, kafedra müdiri və dekan vəzifələrində çalışıb. H.Mirzəyev 1965-ci ildə namizədlik, 1988-ci ildə doktorluq dissertasiyalarını müdafiə edib. 1990-cı ildə professor elmi adını alıb.

Azərbaycan filologiya elminin inkişafında H. Mirzəyevin özünəməxsus xidmətləri var. O, dilçiliyin müxtəlif problemlərinə dair bir sıra sanballı tədqiqatları ilə tanınırdı. Alimin xüsusən Qərbi Azərbaycanın yer adları ilə bağlı araşdırmaları milli tariximizin öyrənilməsi baxımından xüsusi əhəmiyyət kəsb edir. H. Mirzəyevin 200-dən çox elmi əsəri, o cümlədən 25 kitabı və 10-a yaxın dərs vəsaiti işıq üzü





görüb. Eyni zamanda mütəmadi olaraq bədii yaradıcılıqla məşğul olurdu. H.Mirzəyev böyük alim olmaqla yanaşı, həm də tanınmış ictimai-siyasi xadim idi. O, Azərbaycan Respublikası Milli Məclisinin I çağırışında 22 saylı Binəqədi ikinci seçki dairəsindən deputat seçilmişdir. H.Mirzəyev 2002-ci ildə Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin Fərmanı ilə ”Şöhrət” ordeninə, 2007-ci ildə isə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə “Əməkdar elm xadimi” fəxri adına layiq görülmüşdür. Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdçüsü idi.

H. Mirzəyev 25 fevral 2015-ci ildə Bakı şəhərində vəfat edib. Fəxri Xiyabanda dəfn edilib.

Rektor Cəfər Cəfərov qeyd edib ki, bu günlərdə YAP-ın yaradılmasının 25-ci ildönümü ilə bağlı keçirilən tədbirdə dövlət başçımız cənab İlham Əliyev partiyanın keçdiyi böyük və şərəfli inkişaf yoluna nəzər salıb, partiyanın fəaliyyətini, o cümlədən 91-lərin fəaliyyətini yüksək qiymətləndirib. H.Mirzəyev ulu öndər Heydər Əliyevin sədaqətli silahdaşlarından biri olaraq YAP-ın yaradılmasında və təşkilatmasında mühüm xidmətlər göstərib. Qədirbilən xalqımız böyük və işıqlı insan olan H.Mirzəyevin xatirəsini həmişə əziz tutacaq.

Tədbirdə professor H.Mirzəyevin həyat və fəaliyyəti ilə bağlı film nümayiş etdirilib.

Tədbirin aparıcısı, Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov professor H.Mirzəyevi Azərbaycan dilçilik elminin inkişafında mühüm xidmətlər göstərən alim, vətənpərvər və görkəmli ziyalı kimi səciyyələndirib.

Tədbirdə Bakı Dövlət Universitetinin rektoru, akademik Abel Məhərrəmov, AMEA-nın vitse-prezidenti, Nizami adına Ədəbiyyat İnstitutunun direktoru, Milli Məclisin Elm və təhsil komitəsinin sədri, akademik İsa Həbibbəyli, Azərbaycan Dillər Universitetinin rektoru, akademik Kamal Abdulla, Azərbaycanda Atatürk Mərkəzinin müdiri, millət vəkili, akademik Nizami Cəfərov, YAP-ın Səbail rayon təşkilatının sədri, millət vəkili, professor Şəmsəddin Hacıyev, millət vəkili Aydın Mirzəzadə çıxış edərək alimlə bağlı xatirələrini bölüşüblər. Çıxışlarda H.Mirzəyev vətənpərvər, həqiqətsevər, sözündə, məsləkində dönməz, cəsarətli, prinsipial, mübariz, çevik, dinamik, dövlətə və dövlətçiliyə sadiq vətəndaş, dərin elmi biliyə, yüksək intellekt səviyyəsinə malik alim olduğu xüsusi vurğulanıb.

Tədbirdə Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin dosenti, Əməkdar artist, bədii qiraət ustası Ağalar Bayramov H.Mirzəyevin şeirlərini söyləyib, aşıqlar onun sözlərinə yazılmış mahnıları, Filologiya fakültəsinin 301-ci qrup tələbəsi Nübar Qafarova və Vəfa Abışova isə Aşıq Mehdi ilə Həsən Mirzənin deyişməsini ifa ediblər. Riyaziyyat və informatika fakültəsinin 304-cü qrup tələbəsi




Flora Kərimli şair Pərvanə Zəngəzurlunun H.Mirzəyevə həsr etdiyi “Ay Həsən Mirzə” şeirini, Filologiya fakültəsinin 303-cü qrup tələbəsi Suday Qasımova isə Mahirə Nağıqızının H.Mirzəyevə həsr etdiyi şeiri söyləyiblər.

Sonda H.Mirzəyevin oğlu Müşfiq Mirzəyev çıxış edərək tədbirin yüksək səviyyədə keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib.

Sonda tədbir iştirakçılarına H.Mirzəyevin 90 illik yubileyi münasibətilə filologiya üzrə elmlər doktoru Mahirə Hüseynovanın elmi redaktorluğu ilə nəşr olunmuş jurnal təqdim edilib.

**“Gənc müəllim”**

# Əməkdar incəsənət xadimi, şair Mirmehdi Seyidzadənin 110 illiyinə həsr olunmuş tədbir

Noyabrın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU), "Könüllülər" Kitabxana İctimai Birliyinin və Lider TV-nin birgə təşkilatçılığı ilə universitetdə Əməkdar incəsənət xadimi, şair Mirmehdi Seyidzadənin 110 illiyinə həsr olunmuş "Yazdım gözəllər eşqinə" adlı musiqili-bədii tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, müəllim və tələbələri, şair və yazıçılar, ziyalılar, incəsənət xadimləri iştirak ediblər.





Tədbirin aparıcısı, Əməkdar jurnalist, fəlsəfə doktoru Qafar Əsgərzadə tədbirin keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib. Bildirib ki, bu gün Azərbaycan ədəbiyyatına, mədəniyyətinə dövlət tərəfindən böyük qiymət verilir, xüsusi qayğı göstərilir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev, Birinci vitse-prezident Mehriban xanım Əliyeva ədəbiyyata, mədəniyyətə xüsusi diqqət və qayğı göstərir. Bizim bu gün ADPU-da Əməkdar incəsənət xadimi, şair Mirmehdi Seyidzadənin 110 illiyinə həsr olunmuş tədbiri keçirməyimiz də bu diqqət və qayğının ifadəsidir. Mirmehdi Seyidzadə ADPU-nun məzunu olub. XX əsr Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsi Mirmehdi Seyidzadə klassik uşaq şairi, dramaturq, tərcüməçi, gözəl poemalar, lirik şeirlər, qəzəllər, tərcümələr, sevilən lirik mahnıların müəllifidir. Onun şeirləri və mahnıları böyük bir nəslin vətənpərvərlik ruhunda tərbiyə olunmasında mühüm rol oynayıb. O, ilk növbədə, uşaq şairidir. Uşaqların psixologiyasına, mənəvi dünyasına yaxından bələd olan şair onların qəlbinə yol tapıb. Soy-kökünə bağlı olan şair həmişə öz yaradıcılığında şifahi xalq ədəbiyyatına, dastanlara, nağıllara müraciət edib. Bunu şairin uşaqlar üçün yazdığı şeirlərindən açıq-aşkar görmək mümkündür. Eyni zamanda şairin həzin lirikası insan qəlbinin dərinliyinə nüfuz edir. Qəlb şairi Mirmehdi Seyidzadə həm də gözəl məhəbbət şeirlərinin müəllifidir. Klassik rus və dünya ədəbiyyatına dərindən bələd olan şair ədəbiyyatımıza mahir bir tərcüməçi kimi də daxil olub. Onun rus və dünya ədəbiyyatından etdiyi tərcümələr yüksək səviyyəsi, mükəmməlliyi ilə seçilib. Klassik ədəbiyyatımızı, əruz vəznini mükəmməl bilən Mirmehdi Seyidzadə gözəl qəzəllər yaradıb. Onun şeirləri məzmun və forma baxımından fərqli olsa da, bu şeirlərdə şairin kövrək hissləri, qəlb çırpıntıları özünü büruzə verir. Onun özünəməxsus yaradıcılıq dəst-xətti, üslubu olub. Nəğməkar şair Mirmehdi Seyidzadənin şeirlərinə dövrümüzün qüdrətli bəstəkarları mahnılar bəstələyiblər. Bu mahnılar böyük sənətkarlarımızın repertuarında xüsusi yer tutur. Onun əsərlərindəki estetik zövq və mədəniyyət, vətənpərvərlik bizim varlığımıza, qəlbimizə daxil olub. İkinci Dünya müharibəsinin iştirakçısı olmuş şair bu mövzuda da əsərlər yazıb. İndi də aktuallığını saxlayan bu əsərlər gənclərimizin hərbi vətənpərvərlik ruhunda tərbiyə olunmasında əhəmiyyətli rol oynayır. Bütün bunlarla yanaşı, Mirmehdi Seyidzadə həm də yüksək mənəviyyat, mədəniyyət sahibi, alicənab bir insan idi. Mirmehdi Seyidzadə həmişə oxucular tərəfindən maraqla oxunan, sevilən bir şair olacaq.

Tədbirdə şairin həyat və yaradıcılığı ilə bağlı videoçarx nümayiş etdirilib.

Xalq şairi Nəriman Həsənzadə, professor, şair Zahid Xəlil, Xalq artisti Eldost Bayram, şair, Əməkdar müəllim Ofelya Babayeva, Hacı Aqil Məlikov və başqaları çıxış edərək Mirmehdi Seyidzadəni istedadlı şair və dramaturq, ləyaqətli vətəndaş, görkəmli ziyalı kimi səciyyələndiriblər.

Mirmehdi Seyidzadənin qızı Əsmər Seyidzadə çıxış edərək tədbirin keçirilməsində əməyi keçən hər kəsə təşəkkür edib və atası ilə bağlı xatirələrini bölüşüb.

Tədbirdə tələbələr, şagirdlər Mirmehdi Seyidzadənin şeirlərini səsləndirib, tanınmış incəsənət ustaları şairin sözlərinə yazılmış mahnıları ifa ediblər.

**Mahirə Mustafayeva**

# "Ali təhsildən gözləntilər" adlı seminar

Noyabrın 21-də Təhsil Nazirliyinin təşkilatçılığı ilə "Ali təhsildən gözləntilər" mövzusunda seminar keçirilib. Seminarda Təhsil Nazirliyinin nümayəndələri, media kapitanları, təhsil ekspertləri, ali təhsil müəssisələrinin mətbuat xidmətlərinin rəhbərləri və kütləvi informasiya vasitələrinin təmsilçiləri iştirak ediblər.

Təhsil Nazirliyinin İctimaiyyətlə əlaqələr sektorunun müdiri Cəsarət Valehov bildirib ki, tədbirin keçirilməsində məqsəd son 4 ildə ali təhsil müəssisələrinə qəbul imtahanlarının nəticələrində müşahidə olunan müsbət dinamika barədə məlumat verilməsi və ali təhsildə qarşıda duran vəzifələrin müzakirə edilməsidir.



Seminarda "Tələbə qəbulunun nəticələrinin təhlili" mövzusunda təqdimatla çıxış edən Təhsil Nazirliyinin Aparat rəhbərinin müavini, Elm, ali və orta ixtisas təhsili şöbəsinin müdiri Yaqub Piriyev son 4 tədris ili üzrə ali təhsil müəssisələrinə tələbə qəbulunun kəmiyyət və keyfiyyət göstəriciləri ilə bağlı məlumat verib, qəbul imtahanlarının nəticələrində müsbət dinamikanın müşahidə edildiyini vurğulayıb.

Bildirilib ki, son illərdə ali təhsil müəssisələrinə qəbul olunanların orta bal göstəricisi artıb. Müsbət dinamika bütün ixtisas qrupları üzrə də müşahidə olunub. Bu il qəbul imtahanlarında 2472 nəfər 600 baldan yuxarı nəticə göstərib. Ötən il bu rəqəm 2281, 2015-ci ildə 2094, 2014-cü ildə isə 1725 nəfər təşkil edib. Magistraturaya qəbul imtahanlarında bakalavrların ümumi nəticələri ötən tədris ilinə nisbətən 36,3 faiz artıb.

Seminarda qeyd olunub ki, bu tədris ilində Azərbaycanın ali təhsil müəssisələrində təhsil alan əcnəbi tələbələrin sayı ötən illərlə müqayisədə artaraq 5410 nəfər təşkil edib. Ali təhsil müəssisələrində Dövlət Proqramı ilə xaricdə təhsil almış 100-dən çox əməkdaş çalışır.

Cari tədris ilində ali təhsil müəssisələrində ingilis dilində tədris olunan ixtisaslara qəbul olunan tələbələrin sayı iki dəfə artıb.

"Clarivate Analytics" təşkilatının Azərbaycan üzrə nümayəndəsi Aygün Babazadə qeyd edib ki, 2015-ci ilin dekabr ayından dünyanın aparıcı elmi platforması olan "Web of Science" ilə əməkdaşlıq nəticəsində Azərbaycanın təhsil müəssisələrinin müəllim və tələbələrinin bu elmi bazada indekslənən məqalələrinin sayı 57 faiz artıb. Son 3 ildə Təhsil Nazirliyinin tabeliyindəki ali təhsil müəssisələrinin impakt faktorlu jurnallarda çap olunan məqalələrinin sayı 950 olub.

Seminarda pedaqoji ixtisaslara qəbul olunanların, ali təhsil müəssisələrində Prezident təqaüdçülərinin tədris illəri üzrə sayı və artım dinamikası, eləcə də son 3 il ərzində 541 nəfərin fəlsəfə doktoru,103 nəfərin elmlər doktoru elmi dərəcələrini alması barədə məlumat verilib.

Sonra təqdim edilən mövzular ətrafında fikir mübadiləsi aparılıb.

# Tələbələrin I İfaçılıq və Yaradıcılıq Müsabiqəsinin qaliblərinə mükafatlar və diplomlar təqdim edilib

Noyabrın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin təşəbbüsü və təşkilatçılığı, "Optimal" şirkətinin maliyyə dəstəyi ilə görkəmli bəstəkar, Xalq artisti, Dövlət Mükafatı laureatı, ictimai xadim Tofiq Quliyevin 100 illik yubileyinə həsr olunmuş Tələbələrin I İfaçılıq və Yaradıcılıq Müsabiqəsinin qaliblərinə mükafatların və diplomların təqdim edilməsi ilə bağlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, fakültənin müəllim və tələbələri, "Optimal" şirkətinin nümayəndələri iştirak ediblər. Tədbirdən öncə ADPU-nun rektoru, professor Cəfər Cəfərov tələbələrin sərgiyə təqdim etdikləri rəsm əsərləri ilə tanış olub, onların öz əsərləri ilə bağlı fikir və təəssüratlarını dinləyib.



Tədbiri giriş sözü ilə açan fakültənin dekanı, dosent Laçın Həsənova bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev bu il fevralın 7-də böyük bəstəkar Tofiq Quliyevin 100 illik yubileyinin keçirilməsi haqqında Sərəncam imzalayıb. Bu müsabiqə də həmin Sərəncama uyğun olaraq keçirilir. Dosent L.Həsənova müsabiqənin keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun və "Optimal" şirkətinin rəhbərliyinə təşəkkür edib.

Musiqi və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zemfira Abdullayeva çıxış edərək müsabiqə barədə məlumat verib. Qeyd edib ki, iki mərhələdən ibarət olan müsabiqə 3 nominasiya üzrə: instrumental ifaçılığı (fortepiano, tar), vokal ifaçılığı və rəsm nominasiyaları üzrə keçirilib. Müsabiqənin keçirilməsi üçün Tərbiyə işləri üzrə prorektor, professor Fikrət Rzayevin sədrliyi ilə Münsiflər Heyəti yaradılıb. Münsiflər Heyətinin üzvləri isə fakültənin dekanı, dosent Laçın Həsənova, Musiqi və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zemfira Abdullayeva, həmin kafedranın dosenti, Azərbaycan Bəstəkarlar İttifaqının üzvü, Əməkdar incəsənət xadimi Nailə Mirməmmədli, Təsviri incəsənət və onun tədrisi metodikası kafedrasının müdiri, dosent Çingiz Rüstəmov, Bakı Musiqi Akademiyasının baş müəllimi Gülbəniz Abdullayeva, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin İnstrumental ifaçılığı kafedrasının dosenti Camalə Nəsirovadır. Müsabiqənin oktyabrın 28-də keçirilən I turunda instrumental ifaçılığı nominasiyası üzrə 8 ifaçı, vokal ifaçılığı nominasiyası üzrə 6 ifaçı iştirak edib. I turun nəticələrinə görə instrumental ifaçılığı nominasiyası üzrə 5 ifaçı (4-ü fortepiano, 1-i tar) və vokal ifaçılığı nominasiyası üzrə 4 ifaçı müsabiqənin II turuna keçiblər. Noyabrın 4-də müsabiqənin II (yekun) turu keçirilib. Münsiflər Heyətinin qərarı ilə instrumental ifaçılığı nominiasiyası üzrə I dərəcəli laureat adına II tədris ili tələbəsi Çinarə Quliyeva (fortepiano, müəllim dosent A.Hüseynova), II dərəcəli laureat adına III tədris ili tələbəsi Məhərrəməli Əlişanov (tar, baş müəllim C.Osmanov), III dərəcəli laureat adına II tədris ili tələbəsi Nərgiz Əliyeva (fortepiano, müəllim dosent A.Hüseynova) layiq görülüblər.



Vokal ifaçılığı nominasiyası üzrə I yerə iki müsabiqənin iştirakçıları olmuş ADPU-nun 2017-ci il məzunu Məxfirət Hüseynova və Magistratura və doktorantura şöbəsinin I tədris ili magistri Aygün Abbaszadə layiq görülüblər. III yerə Magistratura və doktorantura şöbəsinin I tədris ili magistri Əsmər Ələkbərova layiq görülüb.

Rəsm nominasiyası üzrə I yerə IV tədris ili tələbəsi Gülnisə Əsgərzadə, II yerə ADPU-nun 2017-ci il məzunu Nuranə Abdullayeva, III yerə isə IV tədris ili tələbəsi Şəhanə Mansurova layiq görülüblər.

Qeyd edək ki, müsabiqədə I yeri tutanlara 200 manat, II yeri tutanlara 150 manat, III yeri tutanlara 100 manat mükafat verilib. Digər iştirakçılar-Könül Məmmədova, Vüsalə Şükürlü, Gülsənəm Şahbazova, Ləman Ağazadə, Sənəm Rəhmanova, Hikmət Mustafazadə, Zəhra Qasımova, Arəstə Məmmədli, Nigar Həsənova, Aytəkin Mustafayeva, Radik Şıxkərimov, Yaqut Barxudarzadə, Dilbər Hüseynova, Nigar Əsədova, Jalə Quluzadə və Ülviyyə Babaşova diplomlarla təltif ediliblər.

Tədbirdə Əməkdar incəsənət xadimi Nailə Mirməmmədli çıxış edərək məşhur bəstəkar Tofiq Quliyevlə balı xatirələrini bölüşüb və tələbələrə uğurlar arzulayıb.

Tədbirdə çıxış edən rektor Cəfər Cəfərov belə müsabiqələrin tələbə-gənclərin yaradıcılıq istedadlarının inkişaf etməsinə, təxəyyüllərinin zənginləşməsinə, peşəkar mütəxəssis kimi yetişmələrinə səmərəli təsir etdiyini vurğulayıb və onlara yeni-yeni uğurlar arzulayıb.

Sonda xatirə şəkli çəkdirilib.

**Könül Nəzərova**

# Tələbələrin I İfaçılıq və Yaradıcılıq Müsabiqəsinin qaliblərinin konserti




**Noyabrın 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) görkəmli bəstəkar, Xalq artisti, Dövlət Mükafatı laureatı, ictimai xadim Tofiq Quliyevin 100 illik yubileyinə həsr edilmiş Tələbələrin I İfaçılıq və Yaradıcılıq Müsabiqəsinin qaliblərinin konserti keçirilib. Qeyd edək ki, konsertdə ADPU ilə yanaşı, digər ali təhsil müəssisələrinin tələbələri də iştirak ediblər.**

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev bu il fevralın 7-də böyük bəstəkar Tofiq Quliyevin 100 illik yubileyinin keçirilməsi haqqında Sərəncam imzalayıb. Həmin Sərəncama uyğun olaraq ADPU-nun Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə Tələbələrin I İfaçılıq və Yaradıcılıq Müsabiqəsi keçirilib. İki mərhələdən ibarət olan müsabiqə 3 nominasiya üzrə: instrumental ifaçılığı (fortepiano, tar), vokal ifaçılığı və rəsm nominasiyaları üzrə keçirilib. Oktyabrın 28-də müsabiqənin I turu, noyabrın 4-də isə II (yekun) turu keçirilib. Noyabrın 17-də müsabiqənin qaliblərinə mükafatların təqdim edilməsi ilə bağlı tədbir keçirilib. Ulu öndər Heydər Əliyev Tofiq Quliyevin yaradıcılığına yüksək qiymət verirdi. Unudulmaz dahi bəstəkar Tofiq Quliyev Azərbaycan musiqi mədəniyyətinin inkişafında misilsiz xidmətlər göstərib. Onun yüksək səviyyəli musiqi əsərləri həyatımızın bir hissəsinə çevrilib. Rektor çıxışının sonunda müsabiqənin keçirilməsinə görə fakültənin müəllim və tələbələrinə təşəkkür edib.

Konsertdə Tofiq Quliyevin həyat və yaradıcılığını əks etdirən film nümayiş etdirilib. ADPU-nun və digər ali təhsil müəssisələrinin tələbə-gəncləri bəstəkarın mahnılarını ifa ediblər. Maraqlı və rəngarəng keçən konsert proqramı hamıda yüksək əhvali-ruhiyyə yaradıb.

Sonda xatirə şəkli çəkdirilib.





# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin "Səslər aləminə səyahət" adlı elmi seminarı

Noyabrın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin Korreksiyaedici təlim kafedrasının "Loqoped" dərnəyinin keçirdiyi növbəti elmi seminar



Beynəlxalq Loqopedlər Gününə həsr edilib. "Səslər aləminə səyahət" adlı elmi seminarda ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, Həmkarlar İtti-



faqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, Korreksiyaedici təlim kafedrasının müdiri, dosent Nailə Hüseynova, Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, professor Müseyib İlyasov, fakültənin professor-müəllim heyəti, bakalavr və magistr səviyyəsi üzrə təhsil alan tələbələr iştirak ediblər.

Seminarı giriş sözü ilə fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva açaraq seminar iştirakçılarına uğurlar arzulayıb.

Qeyd edək ki, seminar "Loqoped" dərnəyinin rəhbəri, pedaqogika üzrə fəlsəfə doktoru, baş müəllim Səbinə Aslanovanın rəhbərliyi ilə "Korreksiyaedici təlimin metodu və metodologiyası" ixtisasının I və II tədris ili magistrləri və "Korreksiyaedici təlim ixtisası" bakalavrlarının birgə fəaliyyəti nəticəsində ərsəyə gəlib.

Elmi seminarda "Nitq fiziologiyası", "Səs tələffüzünün və nitqin qrammatik strukturunun pozulmaları", "Nitqin tempo-ritmik pozulmaları" və "Yazılı nitqin pozulmaları" mövzularında maraqlı çıxışlar edilib. Çıxışlar zamanı izah edilən məsələlərin auditoriyaya tam aydın və maraqlı olması üçün videoçarxlardan, slaydlardan istifadə edilib. Tədbir uğurla başa çatıb.

# Böyük rus şairi Sergey Yeseninə həsr olunmuş musiqili-ədəbi tədbir



Noyabrın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil və Filologiya fakültələrinin birgə təşkilatçılığı ilə böyük rus şairi Sergey Yeseninə həsr olunmuş musiqili-ədəbi tədbir keçirilib. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, hər iki fakültənin dekan və dekan müavinləri, Rusiya Mətbuat və Mədəniyyət Mərkəzinin nümayəndələri və Sergey Yesenin yaradıcılığı ilə maraqlananlar iştirak ediblər. Tədbirdə Filologiya fakültəsinin Xarici dillər və onların tədrisi metodikası kafedrasının rəhbərliyi ilə "İbtidai sinif müəllimliyi" ixtisası üzrə təhsil alan tələbələr iştirak ediblər.



Tədbiri Xarici dillər və onların tədrisi metodikası kafedrasının müdiri, filologiya üzrə elmlər doktoru Leyla Vəzirova açıq elan etdikdən sonra söz şeirə və musiqiyə verilib. Tədbirdə tələbələr Sergey Yeseninin şeirlərini, poemasından parçaları və onun sözlərinə yazılmış mahnıları ifa ediblər.

Sonda rektor Cəfər Cəfərov çıxış edərək Sergey Yeseninin yaradıcılığını, poeziyasını sevdiyini, tədbirin təşkilindən və tələbələrin çıxışlarından razı qaldığını bildirib və gələcəkdə belə tədbirləri daha böyük auditoriya qarşısında, səhnədə təşkil etməyi tövsiyə edib.

Tədbirin sonunda xatirə şəkilləri çəkdirilib.

# Tələbə qızlar arasında voleybol yarışının qalibləri mükafatlandırılıb

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Həmkarlar İttifaqı Komitəsinin təşəbbüsü və təşkilatçılığı ilə noyabrın 1-dən 12 komandadan ibarət tə-



ləbə qızlar arasında voleybol yarışına start verilib. Qeyd edək ki, yarış 2 qrup-"A" və "B" qrupları arasında 17 noyabra qədər davam edib. Sonda "A" qrupundan Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin komandası I yeri, Kimya və biologiya fakültəsinin komandası II yeri tutub. "B" qrupundan Fizika və texnologiya fakültəsinin komandası I yeri, Riyaziyyat və informatika fakültəsinin komandası isə II yeri tutaraq finala vəsiqə qazanıblar.

Noyabrın 17-də 2 qrup arasında I,II,III yerlər uğrunda mübarizə gedib. Yarışın final mərhələsini ADPU-nun rektoru, professor Cəfər Cəfərov izləyib. Finalda Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin komandası I yeri, Fizika və texnologiya fakültəsinin komandası II yeri, Kimya və biologiya fakültəsinin komandası isə III yeri tutub. Yarış qalibləri kubok, diplom və medallarla mükafatlandırılıblar.

# ADPU-nun əməkdaşları PETRA layihəsi çərçivəsində Qazi Universitetində keçirilən növbəti görüşdə iştirak ediblər




Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) tərəfdaş olduğu İspaniyanın Valensiya Politexnik Universitetinin koordinatorluğu ilə ERASMUS+ çərçivəsində Azərbaycan universitetlərində təlim prosesinin təkmilləşdirilməsi, universitetin öyrənmə-öyrətmə prosesi ilə bağlı ehtiyacların müəyyənləşdirilməsi və onların daxili müzakirəsinin aparılması istiqamətində "Öyrənmə və Təlimin Təkmilləşdirilməsi" (PETRA) layihəsinin növbəti görüşü 20-24 noyabr 2017-ci ildə Türkiyənin Ankara şəhərində yerləşən Qazi Universitetində keçirildi. Təlim səfərində ADPU-nun əməkdaşları ilə yanaşı, layihənin yerli (Azərbaycan Respublikası Təhsil Nazirliyi, Azərbaycan Dövlət Pedaqoji Universiteti, Xəzər Universiteti, Naxçıvan Dövlət Universiteti, Azərbaycan Dillər Universiteti, Sumqayıt Dövlət Universiteti, Gəncə Dövlət Universiteti, Bakı Slavyan Universiteti, Azərbaycan Universiteti) və avropalı (Valensiya Universiteti-İspaniya, Qazi Universiteti-Türkiyə, Vyana Tətbiqi Elmlər Universiteti-Avstriya, Debreçen Universiteti-Macarıstan, Jivaskala Universiteti-Finlandiya) tərəfdaşları da iştirak edirdilər.

Qazi Universitetinin prorektoru, professor Yaşar Aydemirin açılış nitqi ilə başlayan görüşün rəsmi hissəsi professor Adnan Kan, dosent Salih Şahin və dosent Özlem Yağbasanın qonaqları salamlaması ilə başa çatdı. Səfər zamanı iştirakçılar Qazi Universitetinin inzibati şöbələri, elmi-tədqiqat laboratoriyaları və kitabxanası ilə tanış oldular. Görüşün birinci günü universitet nümayəndələrinin ulu öndər Mustafa Kamal Atatürkün məzarını ziyarəti ilə başa çatdı.

Qazi Universitetinin Keyfiyyətə təminat mərkəzi və əməkdaşları ilə görüşən iştirakçılar, Orhan Ozan Yoncalıkın təqdimatında keyfiyyət standartları və qiymətləndirmə vasitələri haqqında məlumatlandırıldılar. Layihə çərçivəsində nəzərdə tutulan görüşdə universitetlərin nümayəndələri Xüsusi Təhsil fakültəsi ilə tanış olaraq, universitetin tərkibində fəaliyyət göstərən Təhsil Elmləri İnstitutu- professor doktor Selma Yel başda olmaqla, onların əməkdaşları, kimya elmi-tədqiqat laboratoriyası - Nihal Atalay, fizika elmi-tədqiqat laboratoriyası-Volkan Damlı və biologiya elmi-tədqiqat laboratoriyası-Tahir Atıcı, onların əməkdaşları və iş prinsipləri ilə tanış olaraq əməkdaşlıq, bilik və təcrübə mübadiləsi imkanlarını müzakirə etdilər.

Görüşün ikinci günündə nümayəndələr Azərbaycanın ümummilli lideri Heydər Əliyevin adına Ankarada yerləşən parkı ziyarət edərək Ulu Öndərin abidəsi önündə xatirə şəkli çəkdirdilər.

Qeyd edək ki, səfər ərəfəsində ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə Qazi Universitetinin Korreksiyaedici fakültəsinin loqopedi, doktor Bülent Gündüz ilə görüşərək universitetlərarası müqaviləyə əsaslanan mümkün əməkdaşlıq imkanlarını müzakirə etmişdilər.

Təlim səfəri zamanı ADPU-nun nümayəndələri professor, doktor Melike Özer Keskin və professor, doktor Fatih Taşarın dərslərində iştirak etmiş, dərs zamanı istifadə olunan müxtəlif təlim metodlarını birgə müzakirə etmişlər. Görüş sonrası layihə iştirakçıları Türkiyə Böyük Millət Məclisində Türkiyə-Azərbaycan Dostluq Qrupu və Türkiyə-İraq Dostluq Qrupunun üzvü Nurəddin Arasla görüşmüş, Türkiyə-Azərbaycan münasibətləri haqqında müzakirələr aparmışlar.

Azərbaycan universitetlərindən ibarət olan nümayəndə qrupu Məhəmməd Əmin Rəsulzadə adına liseyi ziyarət edərək liseyin əməkdaşları və şagirdləri ilə tanış olmuş, liseyin fəaliyyəti və nailiyyətləri ilə maraqlanmış, daha sonra Məhəmməd Əmin Rəsulzadənin məzarını ziyarət etmişlər.

Səfərin sonuncu günündə tərəfdaş universitetlərin nümayəndələri Ankaradan 116 km məsafədə yerləşən Kızılcahamam ərazisində Coğrafiya fənni üzrə açıq havada keçirilən dərsdə iştirak edərək müəllimin təşkilati fəaliyyəti ilə tanış oldular, tələbələrin sərbəst fəaliyyətlərini və istifadə olunan təlim metodlarını təhlil etdilər.

# Riyaziyyat və informatika fakültəsində "Davamlı inkişaf: problemlər və nailiyyətlər. Dayanıqlı inkişaf məqsədləri (2016-2030)" mövzusunda təqdimat

Noyabrın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov Riyaziyyat və informatika fakültəsinin tələbələri və professor-müəllim heyəti üçün "Davamlı inkişaf: problemlər və nailiyyətlər. Dayanıqlı inkişaf məqsədləri (2016-2030)" mövzusunda təqdimatla çıxış edib. Təqdimatda təbiət-cəmiyyət münasibətlərinin tarixi təhlili, XX əsrin II yarısında insanın qlobal geoloji qüvvəyə çevrilməsi və təbiətdən qeyri-səmərəli istifadə nəticəsində yaranan fəsadlar araşdırılıb. Problemin həlli kimi XX əsrin 80-ci illərində irəli sürülən "Davamlı inkişaf konsepsiyası. Minilliyin inkişaf məqsədləri (2000-2015)" çərçivəsində ölkəmizdə əldə edilmiş nailiyyətlər və dayanıqlı inkişaf məqsədləri (2016-2030) üzrə həyata keçiriləcək işlər və mövcud problemlər müzakirə edilib. Təqdimat maraqla dinlənilib və Dayanıqlı İnkişaf Məqsədləri üzrə Milli Koordinasiya Şurasında Təhsil üzrə işçi qrupunun yaradılması təklif edilib. Tarix və coğrafiya fakültəsində Davamlı İnkişaf üzrə İnformasiya və Təlim Mərkəzinin (DİİTM) yaradılması təşəbbüsü təqdir olunub və bu Mərkəzin tezliklə fəaliyyətə başlaması tövsiyə edilib.





Riyaziyyat və informatika fakültəsinin dekanı, riyaziyyat üzrə elmlər doktoru Maqsud Nəcəfov çıxış edərək təqdimata görə dosent Ş.Pənahova dinləyicilər adından təşəkkür edib və bu mövzunun ölkəmiz üçün həyatı aktuallığını vurğulayıb.

# Tarix və coğrafiya fakültəsində "Sosial işin ölkələrin inkişafında rolu və Azərbaycanda sosial iş" mövzusunda tədbir

Noyabrın 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və coğrafiya fakültəsində "Sosial iş" ixtisasında təhsil alan tələbələrlə "Sosial işin ölkələrin inkişafında rolu və Azərbaycanda sosial iş" mövzusunda tədbir keçirilib. Tədbirdə Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Fəlsəfə və sosial fənlər kafedrasının müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundov, sosioloq, iqtisadiyyat üzrə fəlsəfə doktoru Əhməd Qəşəmoğlu və müəllimlər iştirak ediblər.



Dosent Şahin Pənahov tədbiri giriş sözü ilə açaraq sosial iş elminin və peşəsinin insanlar üçün, cəmiyyət üçün faydasından, ADPU-da "Sosial iş" ixtisası üzrə bakalavr hazırlığının aparılmasından danışıb. Fəlsəfə və sosial fənlər kafedrası və Azərbaycan Sosial İş İctimai Birliyinin (ASİİB) birgə təşkilatçılığı ilə tədbirin keçirilməsinin əhəmiyyətindən bəhs edən dosent Ş.Pənahov ASİİB-in sosial iş sahəsinin inkişafı yolunda gördüyü işləri müsbət qiymətləndirib.

Sonra birliyin fəal üzvü, Kolumbiya Universitetinin "Sosial iş" ixtisası üzrə magistrantı Könül Cəfərova tərəfindən "Sosial işin ölkələrin inkişafında rolu və Azərbaycanda sosial iş" mövzusunda aparılan təqdimatda sosial işin əhəmiyyəti, praktik fəaliyyətlə bağlı konkret misallar, ölkədə sosial iş peşəsinin vəziyyəti təqdim olunub.Təqdimat interaktiv şəkildə, auditoriya ilə qarşılıqlı sual-cavab və müzakirələrlə keçirilib. Sonda ASİİB -in PR Koordinatoru Xanbala Əhmədli təmsil etdikləri birlik barəsində geniş məlumat verib, Azərbaycanda sosial işin tanınması və inkişafı, sosial iş təhsilinin təkmilləşdirilməsi istiqamətində təşkilatın fəaliyyətindən danışıb.

Qeyd edək ki, ASİİB cari ilin oktyabr-noyabr aylarında ölkədə sosial iş təhsilinin qiymətləndirilməsi və çatışmazlıqların aşkarlanması məqsədilə tədqiqat həyata keçirir. Tədqiqat çərçivəsində sosial işin tədrisini aparan müəllim heyəti və sosial iş məzunlarını işə götürən QHT-lər, eləcə də dövlət qurumlarının nümayəndələri ilə müsahibələr nəzərdə tutulub. Bu məqsədlə Fəlsəfə və sosial fənlər kafedrasının baş müəllimi, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqovla respondent qismində dərinləşdirilmiş müsahibə aparılıb və verilən cavablar əsasında müvafiq sorğu anketi doldurulub.

# "Gənc müəllimlərə dəstək" layihəsi çərçivəsində görüş

Noyabrın 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) və Zirvə Tədris Mərkəzinin birgə layihəsi olan "Gənc müəllimlərə dəstək" proqramı çərçivəsində universitetdə görüş keçirilib. Tədbiri Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin Tədris prosesinin metodiki təminatı və akkreditasiya bölməsinin mütəxəssisi Könül Əsgərova açaraq Zirvə Tədris Mərkəzinin universitetimizlə əməkdaşlıq etməsindən məmnunluq duyduğunu bildirib. Sonra Zirvə Tədris Mərkəzinin Qara Qarayev filialının müdiri Sənan Ağacanov çıxış edərək belə vacib bir layihənin həyata keçirilməsinə görə universitetin rəhbərliyinə təşəkkür edib. Qeyd edib ki, məqsədləri müəllim olmaq istəyən hər bir tələbəyə Zirvə Tədris Mərkəzində şərait yaratmaq,onlara yiyələndikləri ixtisaslar üzrə geniş praktik biliyə malik olmaq üçün köməklik göstərməkdir.





Sənan müəllim çıxışında müəllimlik peşəsinin önəmindən və müqəddəsliyindən danışaraq tələbələrin bu peşəni seçdiklərinə görə qürur hissi keçirməli olduqlarını bildirib.

Zirvə Tədris Mərkəzinin Nəsimi filialının müdiri Rəşad Kazımov çıxışında mərkəzin 15 illik fəaliyyəti dövründə əldə etdikləri uğurlardan danışıb. Bu müddət ərzində mərkəzin çoxlu sayda məzunlarının ölkəmizin aparıcı universitetlərinə yüksək balla qəbul olunduqlarını və xaricdə təhsillərini davam etdirdiklərini qeyd edib. Zirvə Tədris Mərkəzinin eyni zamanda müəllimlərin bilik və bacarıqlarının artırılmasında və peşəkarlıq səviyyəsinin yüksəldilməsində önəmli rol oynadığını bildirib.

Tədbirdə Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev çıxış edərək belə bir önəmli və məsuliyyətli işi öz üzərinə götürdüyünə görə Zirvə Tədris Mərkəzinin rəhbərliyinə təşəkkürünü bildirib. Dosent S.Əliyev tələbələrə bu layihədən faydalanmağı tövsiyə edib.

Tədbirdə universitetin Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev çıxış edərək Zirvə Tədris Mərkəzinin bu layihəsini dəstəklədiyini bildirib. Dosent V.Əliyev qeyd edib ki, universitetimizin tələbələri həmişə elmi və sosial proqramlarda yaxından iştirak edirlər. O, tələbələrin Zirvə Tədris Mərkəzinin "Gənc müəllimlərə dəstək"proqramında fəal iştirak edəcəklərinə ümidvar olduğunu bildirib.

Sonda Könül Əsgərova tədbir iştirakçılarına öz təşəkkürünü bildirib və ADPU ilə Zirvə Tədris Mərkəzi arasında əməkdaşlığın uzunmüddətli olacağını vurğulayıb.

**Nurlan Səmədov**

# Gənc şair Gülbəniz Mehdiyevanın yaradıcılıq gecəsi

Noyabrın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) gənc şair Gülbəniz Mehdiyevanın yaradıcılıq gecəsi keçirilib. Yaradıcılıq gecəsini giriş sözü ilə Kimya və biologiya fakültəsinin dekanı, dosent Elnarə Mehbalıyeva açıb. Dosent Elnarə




Mehbalıyeva bildirib ki, Kimya və biologiya fakültəsinin IV tədris ili tələbəsi olan Gülbəniz Mehdiyeva hələ I tədris ilində oxuyarkən gözəl şeir ifa etməsi ilə seçilib. Gülbəniz sonradan şair kimi də qələmini sınayıb. Gülbənizin şeirlərindən ibarət "Qəlbimin qonağı" adlı kitabı işıq üzü görüb. Onun şeir ifası insanı necə riqqətə gətirirsə, müəllifi olduğu şeirləri də insanı mənəvi aləmə, Gülbənizin könül dünyasına çəkib aparır. Gülbəniz şeir söyləyərkən sanki onu yaşayır və dinləyici də onunla birgə həmin duyğuları yaşayır. Gülbənizin şeir dünyası öz təmizliyi, rəngarənliyi ilə seçilir. Burada həyat eşqi, nikbinlik, gözəllik, saflıq romantik səpkidə öz əksini tapır. Şeirlər Gülbənizin xəyallarına, düşüncələrinə, duyğularına qapı açır, onu başqa rakursdan da tanımağımıza şərait yaradır.



Dosent E.Mehbalıyeva Gülbəniz Mehdiyevanı təbrik edərək digər istedadlı gənclərə də dəstək olacağını qeyd edib: "Mən çox sevinirəm ki, Gülbənizin gənc şair kimi ilk addımları məhz ADPU-da təhsil aldığı illərdən başlayıb. Çünki o gələcəkdə daha böyük uğurlar qazananda da, böyük şairlərdən birinə çevriləndə də daim ona qucaq açan, dəstək olan doğma məkanı- Azərbaycan Dövlət Pedaqoji Universitetini xatırlayacaqdır. Mən Gülbənizin timsalında yaradıcılıqla məşğul olan bütün tələbələri alqışlayır, onlara yorulmadan, əzmlə çalışmağı tövsiyə edirəm. Çünki istedad elə bir nemətdir ki, o gec-tez aşkar olunacaq və mənsub olduğu yerə, təhsil aldığı universitetə, fakültəyə başucalığı gətirəcəkdir".

Sonra fakültənin Üzvi kimya və kimya texnologiyası kafedrasının müəllimi Səadət Abdullayeva gənc şairi təbrik edib. Qeyd edib ki, belə istedadlı tələbələrə dəstək fakültə rəhbərliyinin daim nəzarətindədir. Çünki istedad hər bir sahədə özünü göstərə bilər. Kimya və biologiya fakültəsində də belə gənclər az deyil. Məhz belə tələbələr üçün "İncəsənət saatı", "Gənc şairlər" cəmiyyəti yaradılıb. "İncəsənət saat"ına rəqs etməyi, mahnı oxumağı, şəkil çəkməyi bacaran və qeyri-adi istedadı olan tələbələr cəlb olunublar. "Gənc şairlər" cəmiyyətində isə hər ayın sonunda şeir yazan tələbələrlə məşhur şairlərin görüşləri təşkil olunur.



Gənc şair Gülbəniz Mehdiyeva çıxış edərək tədbirin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə, həmçinin Kimya və biologiya fakültəsinin kollektivinə təşəkkür edib.

Yaradıcılıq gecəsinin bədii hissəsi fakültənin tələbələri tərəfindən davam etdirilib. Bədii hissədə tələbələrin ifasında gözəl musiqilər və Gülbəniz Mehdiyevanın şeirləri səslənib.

# İbtidai təhsil fakültəsində elmi seminar

***Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsində növbəti elmi seminar keçirilib. Elmi seminarda Riyaziyyatın ibtidai kursunun tədrisi metodikası və İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının əməkdaşları iştirak ediblər.***




Tədbiri İbtidai təhsil fakültəsinin dekanı, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov açaraq son illər fakültədə elmi seminarların keçirilməsinin müntəzəm xarakter aldığını bildirib. O, çıxışında elmi seminarda müzakirə olunan mövzuların təlim prosesi ilə bilavasitə əlaqəli olduğunu qeyd edib.

Sonra çıxış üçün söz Riyaziyyatın ibtidai kursunun tədrisi metodikası kafedrasının dosenti Mübariz Əsədova verilib. O, "İbtidai təhsil fakültəsi tələbələrinin məntiqi təfəkkürünün inkişaf etdirilməsində məsələ həllinin rolu" mövzusunda çıxış edərək qeyd edib ki, riyazi məsələ tələbələrin məntiqi təfəkkürünü inkişaf etdirən əsas vasitələrdən biridir. Çıxışda riyazi təfəkkürün əsas komponentləri -konkret təfəkkür, mücərrəd təfəkkür, induktiv təfəkkür, funksional təfəkkür, dialektik təfəkkür, yaradıcı və inkişafetdirici təfəkkür formaları nəzərdən keçirilib, məsələ həllində kəmiyyətlər arasındakı asılılıqların qeyd olunan komponentlərlə əlaqəsi konkret məsələlərin həllində təhlil olunub. Məsələnin həlli prosesində model və modelləşdirmədən istifadə yolları araşdırılmaqla yanaşı, onların konkret tətbiq sahələri göstərilib. Tələbələrin əldə etdikləri bilik və bacarıqların gələcəkdə ibdidai sinif şagirdlərinin yaş və bilik səviyyəsinə müvafiq formalaşdırılması istiqamətlərinə toxunulub. Təfəkkürün məsələ həllində məhsuldar və yaradıcı olması şərtləri və nəticələri təhlil edilib.

Elmi seminarda Riyaziyyatın ibtidai kursunun tədrisi metodikası kafedrasının baş müəllimi Mehdixan Aşurov "IV sinifdə riyazi anlayışların və təkliflərin öyrədilməsində təfəkkür əməliyyatlarından istifadə" mövzusunda çıxış edib. Məruzəçi təfəkkür fəaliyyətinin inkişafının milli təhsil konsepsiyasında məqsəd kimi qarşıya qoyulmasından, təfəkkür anlayışına psixoloji yanaşmadan, təfəkkür formalarının (anlayışlar, təkliflər və əqli nəticə) IV sinfin riyaziyyat kursunda yeri, təfəkkür prosesinin əməliyyatlarından (təhlil, tərkib, mücərrədləşmə, ümumiləşmə, konkretləşmə və müqayisə), xüsusi halda riyaziyyatın tədrisində bu əməliyyatların xarakterik xüsusiyyətlərindən, IV sinifdə öyrənilən təkliflərin (xassə, qayda, teorem) öyrənilməsində təfəkkür əməliyyatlarından istifadə yollarından danışıb. IV sinifdə keçilən mövzular üzrə təfəkkür əməliyyatlarından istifadə ilə bağlı dərs nümunələri, qarşıya çıxan çətinliklər və onların aradan qaldırılması istiqamətində təkliflər verib.

Sonda məruzəçilər iştirakçıları maraqlandıran sualları cavablandırıblar.

# ADPU-nun nəzdində ADPK-də 9 Noyabr - Dövlət Bayrağı Günü münasibətilə tədbir

Noyabrın 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) 9 Noyabr - Dövlət Bayrağı Günü münasibətilə tədbir keçirilib. Tədbirdə kollecin pedaqoji və tələbə kollektivi və digər qonaqlar iştirak ediblər.

Tədbir iştirakçıları əvvəl tələbələrin əl işlərindən təşkil olunmuş sərgi ilə tanış olublar.



Sonra ADPK-nin müəllimi Hümeyrə Nadiri "Azərbaycan bayrağının tarixi" mövzusunda çıxış edib. Bildirib ki, 9 Noyabr Azərbaycanda Dövlət Bayrağı Günüdür. Azərbaycanın üçrəngli bayrağı dövlət rəmzi olaraq Azərbaycan Xalq Cümhuriyyəti (AXC) Hökumətinin 1918-ci il 9 noyabr tarixli iclasında qəbul olunub.

Daha sonra kollecin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov Dövlət Bayrağı Günü münasibətilə tədbir iştirakçılarını təbrik edib. Natiq qeyd edib ki, üçrəngli bayrağın dövlət rəmzi kimi bərpası təşəbbüsü ilk dəfə ümummilli lider Heydər Əliyev tərəfindən irəli sürülüb. Ulu öndər Heydər Əliyevin siyasi kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Azərbaycanda Dövlət Bayrağı Gününün təsis edilməsi barədə Sərəncamı gənc nəslin vətənpərvərlik ruhunda tərbiyəsi baxımından mühüm əhəmiyyət kəsb edir.

Tədbir bədii hissə ilə davam edib. Tələbələrin ifasında Dövlət Bayrağı Gününə aid şeir söylənilib, mahnı oxunub və ədəbi-bədii kompozisiya nümayiş etdirilib. Həmçinin ADPK-nın xor ansamblının çıxışları alqışlarla qarşılanıb.

# Fizika və texnologiya fakültəsinin "Young physics" klubunun növbəti seminarı

Noyabrın 27-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsinin "Young Physicis" klubunun növbəti seminarı keçirilib. Tədbirdə fakültənin dekanı, fizika üzrə fəlsəfə doktoru Arzu Daşdəmirov, fakültənin Tələbə Elmi Cəmiyyətinin (TEC) sədri, dosent Xatirə Adıgözəlova, Ümumi fizika kafedrasının müdiri, dosent Cahangir Hüseynov, Fizikanın tədrisi metodikası kafedrasının müdiri, dosent Sevinc Cəlilova, Riyaziyyat və informatika fakültəsinin TEC-nin sədri, dosent Sadəddin Haxıyev və fakültənin digər əməkdaşları iştirak ediblər. Fizika və texnologiya fakültəsinin TEC-nin təşkilatçılığı ilə keçirilən seminarda fakültənin tələbələri Zərifə Hüseynovanın, Münəvvər Zeynalovanın, Diliş Həsənlinin ingilis dilində hazırladıqları məruzələr dinlənilib. Məruzəçilər tələbələrin suallarına ətraflı cavab veriblər.



Sonda fakültənin dekanı Arzu Daşdəmirov çıxış edərək tələbələrin ingilis dilində seminarlarının müntəzəm keçirilməsinin zəruriliyini qeyd edib. Müəllim və tələbələrin iştirakı ilə keçirilən seminar maraqla qarşılanıb.

# ADPU-nun Şamaxı Filialında akademik Həsən Əliyevin 110 illik yubileyinə həsr olunmuş tədbir

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında Azərbaycanın görkəmli alimi, ictimai-siyasi və dövlət xadimi, Dövlət Mükafatı laureatı, akademik Həsən Əliyevin 110 illik yubileyinə həsr olunmuş tədbir keçirilib. Tədbirdə filialın rəhbərliyi, professor-müəllim heyəti və tələbələr iştirak ediblər. Tədbirdə ilk olaraq Həsən Əliyevin həyat və yaradıcılığına həsr olunmuş videoçarx nümayiş olunub.**



Giriş sözü ilə çıxış edən filialın direktoru, dosent Tünzalə Yusifova dövrünün görkəmli alimi Həsən Əliyevin həyat və fəaliyyətinə nəzər yetirərək qeyd edib ki, Azərbaycan elmi ictimaiyyətinin böyük fəxrlə "Azərbaycan təbiətinin patriarxı" adlandırdığı akademik Həsən Əliyev mükəmməl tədqiqatçı olmaqla yanaşı, həm də böyük hörmət sahibi, el ağsaqqalı, Vətənini ürəkdən sevən əsl azərbaycanlı idi.

Sonra Humanitar və xüsusi fənlər kafedrasının müdiri, dosent Mayıl Alıcanov akademik Həsən Əliyev haqqında xoş xatirələrini bölüşüb, onun ölkəmiz üçün istedadlı kadrlar yetişdirməsindən, Azərbaycan təbiətinə və elminə verdiyi töhfələrdən, eyni zamanda insanlara qayğıkeş münasibətindən, humanist keyfiyyətlərin daşıyıcısı olmasından bəhs edib.

"Azərbaycan tarixində təbiəti mühafizə təşkilatlarının yaradılmasında Həsən Əliyevin rolu" mövzusunda çıxış edən Təbiət və pedaqoji elmlər kafedrasının müəllimi Yaqut Qasımova bildirib ki, təbiətin mühafizəsinə xüsusi diqqət ayıran akademik ilk dəfə respublikamızda bu problemin həllinin vacibliyi ilə bağlı həyəcan təbilini çalan alimdir. Bir vaxtlar respublikada fəaliyyət göstərmiş Ətraf Mühitə Nəzarət və Təbiəti Mühafizə Komitəsi, Təbiəti Mühafizə Cəmiyyəti bilavasitə böyük alimin şəxsi təşəbbüsü ilə yaradılmışdır.

Təbiət və pedaqoji elmlər kafedrasının müəllimi Zərifə Həmidova Həsən Əliyevin sənətkar ruhlu alim olmasından, vurğunu olduğu Azərbaycan torpağının hər qarışını gəzərək araşdırmalar aparmasından, coğrafiya, xüsusilə torpaqşünaslıq elminə verdiyi töhfələrdən danışıb.

"Tarix və coğrafiya müəllimliyi" ixtisasının IV tədris ili tələbəsi Adilə Hüseynli təbiətə sevgisi ilə müasir gəncliyə ən gözəl nümunə olan Həsən Əliyevin, sözün həqiqi mənasında, həyəcansız oxunması mümkün olmayan "Həyəcan təbili" kitabından bəhs edib. Onun görkəmli alimin "Öz ölkəmiz qədər mənə xoş təsir bağışlayan ikinci bir ölkə tanımıram. Buranın insanları da, iqlimi də, torpağı, suyu, meşəsi, havası da əvəzolunmazdır" ifadəsini qürurla səsləndirməsi alqışlarla qarşılanıb.

# ADPU-nun Ağcabədi Filialında Yeni Azərbaycan Partiyasının yaradılmasının 25 illiyi münasibətilə elmi-praktik konfrans

Noyabrın 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında Yeni Azərbaycan Partiyasının (YAP) Ağcabədi rayon təşkilatı ilə birlikdə partiyanın yaradılmasının 25 illiyi münasibətilə elmi-praktik konfrans keçirilib. Konfransda YAP-ın Ağcabədi rayon təşkilatının sədri, Ağcabədi Rayon İcra Hakimiyyəti başçısının müavini Rövşən Əhmədov, YAP-ın Ağcabədi rayon icra aparatının rəhbəri Nazim Bünyadov iştirak ediblər. Konfransda öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.



Konfransı giriş sözü ilə filialın direktoru, dosent Mətanət Fərzəliyeva açaraq qeyd edib ki, bu gün çox əlamətdar tarixi bir hadisəni- YAP-ın yaradılmasının 25 illiyini qeyd edirik. Ulu öndər Heydər Əliyev tərəfindən yaradılan bu partiya xalqımızı ağır vəziyyətdən çıxararaq müstəqil dövlətimizin varlığını təmin edib. Dosent M.Fərzəliyeva YAP-ın yaranma tarixindən, Ümummilli Liderimizin xalqımız üçün misilsiz tarixi xidmətlərindən ürəkdolusu danışıb.

Sonra İctimai, təbiət fənləri və onların tədrisi metodikası kafedrasının dosenti M.Hüseynov "Heydər Əliyev Yeni Azərbaycan Partiyasının qurucusudur" mövzusunda məruzə edərək göstərib ki, müstəqilliyimizin ilk illərində daxili siyasi qarşıdurmanın dərinləşməsi sayəsində ölkədə böhran vəziyyəti qorxulu həddə çatmışdı. Cəmiyyət ümumxalq inamına malik olan, ilk növbədə, milli birliyə, vətəndaş həmrəyliyinə əsaslanaraq ölkəni böhrandan xilas etməyə qadir olan yeni siyasi qüvvəyə ehtiyac duyurdu. Bu səbəbdən də xalqımızın böyük oğlu Heydər Əliyevin rəhbərliyi altında yeni siyasi partiya yaratmaq istəyi ilə 1992-ci ilin oktyabrında respublikanın bir qrup ziyalısı mətbuatda Ulu Öndərə müraciət ünvanladılar. 21 noyabr 1992-ci ildə YAP-ın Naxçıvanda təsis konfransı keçirildi və Heydər Əliyev YAP-ın sədri seçildi. YAP qısa müddətdə geniş şöhrət qazanaraq cəmiyyətin bütün təbəqələrindən olan sağlam qüvvələri öz ətrafında birləşdirə bilmiş, ümumxalq partiyası olmaq istiqamətində uğurlu addımlar atmışdır.

"YAP bu günün, sabahın və gələcəyin partiyasıdır" mövzusunda məruzə edən dosent əvəzi M.Səlimov qeyd edib ki, partiya hüquqi dövlət və vətəndaş cəmiyyəti quruculuğu ideyalarını həyata keçirmək, ölkədə sivil dəyərlər, demokratik prinsiplər əsasında hərtərəfli inkişafa nail olmaq, insan hüquq və azadlıqlarının təminatı, liberal dəyərlərə söykənən güclü və sosialyönümlü iqtisadiyyat, sosial ədalət və hər bir Azərbaycan vətəndaşının təminatı, rifahı uğrunda mübarizə aparır.

Baş müəllim A.Kərimli "YAP-ın gənclər siyasəti" mövzusunda məruzə edərək bildirib ki, partiya yarandığı ilk dövrlərdən gənclərə xüsusi diqqət və qayğı ilə yanaşıb, müstəqil dövlətimizin gələcəyi olan gənclərin dövlətin qanunvericilik və icra strukturlarında mövqe tutmalarına, onların cəmiyyətdə gedən ictimai-siyasi proseslərdə yaxından iştirak etmələrinə nail olub. Məhz bu qayğının nəticəsində YAP-ın sıralarına gənclərin axını daim artmaqdadır.

Məruzələr ətrafında çıxışlar olub. Dosent əvəzi T.Kərimli şıxış edərək YAP-ın müstəqil dövlətimizin tarixində oynadığı roldan danışıb. Natiq qeyd edib ki, YAP ümumxalq partiyası olmaq səviyyəsinə qalxaraq xalqı düşdüyü ağır vəziyyətdən çıxararaq müstəqilliyimizi qoruyub inkişaf etdirir.

Konfransda iştirak edən YAP-ın Ağcabədi rayon təşkilatının sədri, Ağcabədi Rayon İcra Hakimiyyəti başçısının müavini R.Əhmədov çıxış edərək ulu öndər Heydər Əliyev tərəfindən yaradılan partiyanın keçdiyi şanlı tarixdən, əldə etdiyi uğurlardan danışıb. Sonra R.Əhmədov YAP-ın Ağcabədi rayon təşkilatının 13952 nəfər üzvü olduğunu və təşkilatın rayonda həyata keçirilən sosial-iqtisadi quruculuq işlərində fəal iştirak etdiyini və bu sahədə partiyanın ADPU-nun Ağcabədi Filialı üzrə ilk təşkilatının rolunu da xüsusilə vurğulayıb.

Sonda partiyaya daxil olan tələbələrə üzvlük biletləri təqdim olunub.

# ADPU-nun Quba Filialında 12 Noyabr - Konstitusiya Günü ilə bağlı tədbir

Noyabrın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında 12 Noyabr-Konstitusiya Günü ilə bağlı dəyirmi masa keçirilib. Mövzu ilə bağlı filialın tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, Pedaqoji və ictimai fənlər kafedrasının müəllimi Mürvət Əliyev, Təbiət fənləri və onun tədrisi metodikası kafedrasının müəllimi Əmirağa Şıxəmmədov, filialın Tələbə Elmi Cəmiyyətinin (TEC) sədri Türkanə Abışova çıxış ediblər. Çıxış edənlər Azərbaycan Respublikasının Konstitusiyasında əks olunan maddələrdən, ölkəmizdə ədalətin, azadlığın və təhlükəsizliyin bərqərar olmasından, insan və vətəndaş hüquq və azadlıqlarından, vətəndaşların əsas vəzifələrindən bəhs ediblər.

Sonra tələbələr arasında "Konstitusiyamızı necə bilirik?" adlı sorğu keçirilib. Sorğuda iştirak edən tələbələrə vətəndaşların hüquq və vəzifələrini, Azərbaycan Respublikasının Konstitusiyanın 22 illik tarixini əhatə edən suallar verilib. Suallar tələbələr tərəfindən ətraflı və dolğun cavablandırılıb.



# Şair, yazıçı-publisist Mətanət Ulu Şirvanlı ilə görüş

**Noyabrın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan**



**Yazıçılar Birliyinin üzvü, "Ulu Şirvan" qəzetinin təsisçisi və baş redaktoru, istedadlı şair, yazıçı-publisist, "Qızıl Qələm" media mükafatı laureatı, "Dirili Qurbani" Ədəbi Məclisinin üzvü, Təhsil Nazirliyinin Ekoloji Tərbiyə və Təcrübəçilik Mərkəzinin mütəxəssisi Mətanət Ulu Şirvanlı ilə görüş keçirilib. Görüşdə Filologiya fakültəsinin müəllim və tələbələri iştirak ediblər.**

Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov tədbiri giriş sözü ilə açaraq bildirib ki, belə görüşlər gənclərin dünyagörüşünün genişlənməsinə və onların formalaşmasına müsbət təsir göstərir. Belə görüşlər həm də universitetdə mənəvi mühitin formalaşmasında mühüm rol oynayır. Şair və yazıçılarla keçirilən görüşlər tələbələrin həyatında unudulmaz iz buraxır və həmişə məmnunluq hissi ilə xatırlanır.

Professor B.Xəlilov Mətanət Ulu Şirvanlının həyat və yaradıcılığı haqqında məlumat verib. Qeyd edib ki, Mətanət Ulu Şirvanlı Şamaxıda anadan olub. Mətanət xanımın doğulduğu yurdun, torpağın adını özünə ədəbi imza götürməsi onun Vətənə, yurda bağlılığının təzahürüdür. Mətanət Ulu Şirvanlı özünəməxsus yaradıcılıq üslubuna, dəst-xəttə malik qələm sahibidir. 10-dan çox şeir kitabının, bir neçə bədii və publisistik kitabın müəllifidir. Bu yaxınlarda "Ağ ayaqqabı" adlı yeni kitabı çap edilib. Mütəmadi olaraq televiziya və radioda müsahibələri, dövri mətbuatda, İnternet saytlarında və xəbər portallarında yazıları ilə çıxış edir. Oxucular onun əsərlərini həvəslə, maraqla oxuyurlar, şeirlərinə musiqilər bəstələnir. Mətanət Ulu Şirvanlı vətənpərvər, milli ruhlu bir ziyalıdır. O, xalq, millət, Vətən sevgisi ilə yaşayıb-yaradır. Şair müxtəlif təşkilatlar tərəfindən fəxri fərman və təşəkkürlərə layiq görülüb. Professor B.Xəlilov çıxışının sonunda Mətanət Ulu Şirvanlıya yeni-yeni yaradıcılıq uğurları arzulayıb.



Görüşdə şairin həyat və yaradıcılığı ilə bağlı slayd nümayiş etdirilib.

Azərbaycan və dünya ədəbiyyatı kafedrasının müdiri, professor Himalay Qasımov, Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının dosenti, filologiya üzrə elmlər doktoru Kamil Bəşirov, AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun Müasir Azərbaycan dili şöbəsinin müdiri, professor İsmayıl Kazımov çıxış edərək Mətanət Ulu Şirvanlının ədəbi mühitdə yaxşı tanınan, yüksək bədii istedada malik şair olduğunu vurğulayıblar.

Filologiya fakültəsinin tələbələri Səbinə Abbasova şairin "Azərbaycan", Aytac Əliyeva "Zalımın balası", Sevinc Alışova "Yerdə", Tünzalə Gərayeva "Bilmirəm", Pərvanə Əhmədzadə "Nə deyim", Günel İsmayılova "Gedir", Səriyyə Mehdizadə "İnciyən sevda", Mömünət İsrafilova "Nə qaldı" şeirlərini ifa ediblər.



Şair, yazıçı-publisist Mətanət Ulu Şirvanlı çıxış edərək görüşün keçirilməsinə görə ADPU-nun rəhbərliyinə, həmçinin Filologiya fakültəsinin müəllim və tələbə kollektivinə təşəkkür edib, yeni şeirlərini oxuyub, tələbə-gənclərə kitablarını hədiyyə edib və onların suallarını cavablandırıb.

Sonda xatirə şəkli çəkdirilib.

# ADPU-nun Şəki Filialında Molla Pənah Vaqifin 300 illik yubileyinə həsr olunmuş elmi konfrans

**Noyabrın 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında böyük Azərbaycan şairi Molla Pənah Vaqifin 300 illik yubileyinə həsr olunmuş elmi konfrans keçirilib.**




Konfransı giriş sözü ilə filialın elmi işlər üzrə direktor müavini, dosent Nuralı Çələbiyev açaraq bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 12 yanvar 2017-ci il tarixli Sərəncamı ilə çoxəsrlik ədəbiyyat tariximizdə silinməz izlər qoymuş qüdrətli söz ustası Molla Pənah Vaqifin 300 illik yubileyi dövlət səviyyəsində qeyd olunur. Natiq bildirib ki, bu elmi konfrans da filialın illik iş planına uyğun olaraq, şairin 300 illik yubileyi münasibəti ilə təşkil olunub.

Sonra konfransda filialın Humanitar fənlər kafedrasının baş müəllimi, Azərbaycan Yazıçılar Birliyinin Şəki Bölməsinin sədri Vaqif Aslanın "Molla Pənah Vaqif və Şəki ədəbi mühiti" mövzusunda məruzəsi, Humanitar fənlər kafedrasının müdiri, tarix üzrə fəlsəfə doktoru Vüsal Baxışovun "XVIII əsrin son rübündə Cənubi Qafqazda cərəyan edən geosiyasi proseslərdə Molla Pənah Vaqifin iştirakı", həmin kafedranın baş müəllimləri - Pakizə Zakirovanın "Molla Pənah Vaqifin yaradıcılığının tədqiqi və öyrənilməsi tarixindən", İlahə Süleymanovanın "Molla Pənah Vaqifin özündən sonrakı ədəbi nəslə təsiri", Ümumelmi fənlər kafedrasının baş müəllimi, filologiya üzrə fəlsəfə doktoru Kamil Adışirinovun "Şifahi xalq ədəbiyyatı Molla Pənah Vaqifin yaradıcılığında təzahür edən hedonizmin və nikbinliyin əsas mənbəyi kimi" mövzusunda çıxışları dinlənilib.

Sonra konfrans bədii hissə ilə öz işini davam etdirib. Bədii hissədə filialın tələbələrinin təqdimatında ədəbi-bədii kompoziya nümayiş etdirilib və şairin şeirlərindən nümunələr səsləndirilib.

# ADPU-nun Cəlilabad Filialında 9 Noyabr-Dövlət Bayrağı Gününə həsr olunmuş tədbir

Noyabrın 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad Filialında 9 Noyabr-Dövlət Bayrağı Gününə həsr olunmuş "Bayrağımız qürur mənbəyimizdir" adlı tədbir keçirilib. Öncə tədbirdə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib. Filialın tədris və elmi işlər üzrə direktor müavini Eyvaz Məmmədov bayram münasibətilə qonaqları, müəllim və tələbələri təbrik edib. Dövlət quruculuğunda, dövlətçiliyimizin möhkəmləndirilməsində bayrağın əhəmiyyətindən söz açıb. Tarix üzrə fəlsəfə doktoru Məmmədhəsən Əliyev və Ziya İsmayılov dövlətçilik ənənələrimizin inkişafı və Azərbaycan bayrağının keçdiyi tarixi inkişaf yolu haqqında danışıb. Tədbir tələbələrin bayraq, Vətən mövzusunda şeirləri və çıxışları ilə davam edib.



Sonda Dövlət Bayrağı Günü münsaibətilə təhsildə müvəffəqiyyətləri və ictimai işlərdə fəal iştirakına görə fərqlənən tələbələr filial rəhbərliyinin fəxri fərmanları ilə təltif olunublar.

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi dosent Kamil Şirinova qızı

**Zülfiyənin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fəlsəfə və sosial fənlər kafedrasının dosenti Kamal Hüseynova qardaşı

**İbrahim Hüseynovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Koordinasion birləşmələr elmi-tədqiqat laboratoriyasının müdiri, dosent Nazəni Novruzovaya bacısı

**Ceyran xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fizikanın tədrisi metodikası kafedrasının baş müəllimi Tofiq Hacıyevə atası

**Mirabdulla Hacıyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Nigar ABBASOVA
Məsul katib: Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 3533
Sayı: 1500
Çapa imzalanıb: 30.11.2017-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr şöbəsində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilib.